"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ



H.Əliyev
"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"



AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ



## "GƏNCLƏRİN XARİCİ ÖLKƏLƏRİN NÜFUZLU ALİ TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ TƏHSİL ALMALARINA DAİR 2022–2026-CI İLLƏR ÜÇÜN DÖVLƏT PROQRAMI"NIN TƏSDİQ EDİLMƏSİ HAQQINDA AZƏRBAYCAN RESPUBLİKASI PREZİDENTİNİN SƏRƏNCAMI

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 3-cü bəndini rəhbər tutaraq, "Azərbaycan gənclərinin nüfuzlu xarici ali təhsil müəssisələrində təhsil imkanlarının genişləndirilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 30 sentyabr tarixli 2931 nömrəli Sərəncamının icrasını təmin etmək məqsədilə qərara alıram:

1. "Gənclərin xarici ölkələrin nüfuzlu ali təhsil müəssisələrində təhsil almalarına dair 2022-2026-cı illər üçün Dövlət Proqramı" təsdiq edilsin (əlavə olunur).
2. Azərbaycan Respublikasının Təhsil Nazirliyi:
2.1. bu Sərəncamın 1-ci hissəsi ilə təsdiq edilmiş Dövlət Proqramında nəzərdə tutulan tədbirlərin həyata keçirilməsini əlaqələndirsin;
2.2. Dövlət Proqramının icrasının gedişi barədə ildə bir dəfə Azərbaycan Respublikasının Prezidentinə məlumat versin.
3. Dövlət Proqramında nəzərdə tutulmuş tədbirlərin icrasının monitorinqini və qiymətləndirilməsini Azərbaycan Respublikası Təhsil Nazirliyinin sifarişi əsasında Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyi həyata keçirsin.
4. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev**
**Azərbaycan Respublikasının Prezidenti**
**Bakı şəhəri, 28 fevral 2022-ci il**

## AZƏRBAYCAN RESPUBLİKASI TƏHSİL NAZİRLİYİNİN TABELİYİNDƏ "TƏHSİLİN İNKİŞAFI FONDU" PUBLİK HÜQUQİ ŞƏXSİN YARADILMASI HAQQINDA

"Azərbaycan Respublikası Təhsil Nazirliyinin tabeliyində Təhsilin İnkişafı Fondunun yaradılması haqqında" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 14 iyul tarixli 1399 nömrəli Fərmanının 1-ci hissəsinin və 4.1-ci bəndinin icrasını təmin etmək məqsədilə Azərbaycan Respublikasının Nazirlər Kabineti qərara alır:
1. Azərbaycan Respublikası Təhsil Nazirliyinin tabeliyində "Təhsilin İnkişafı Fondu" publik hüquqi şəxs yaradılsın.
2. "Təhsilin İnkişafı Fondunun Nizamnaməsi" təsdiq edilsin (əlavə olunur).
3. Azərbaycan Respublikasının Təhsil Nazirliyi (bundan sonra - Nazirlik):
3.1. iki ay müddətində:
3.1.1. tabeliyindəki "Təhsilin İnkişafı Fondu"nun (bundan sonra - Fond) fəaliyyətini təmin etmək məqsədilə sədr və onun müavini daxil olmaqla, Fondun İdarə Heyətinin üzvlərini təyin etsin;
3.1.2. Fondun strukturunu, əməyin ödənişi fondunu, işçilərin say həddini və ştat cədvəlini, habelə işçilərin əməkhaqlarının məbləğini (vəzifə maaşını, vəzifə maaşına əlavələri, mükafatları və digər ödənişləri) təsdiq etsin;
3.2. Fondun dövlət qeydiyyatına alınması üçün bu Qərarın qüvvəyə mindiyi tarixdən 3 (üç) gün müddətində "Hüquqi şəxslərin
2
dövlət qeydiyyatı və dövlət reyestri haqqında" Azərbaycan Respublikasının Qanunu ilə müəyyən edilmiş qaydada Azərbaycan Respublikasının İqtisadiyyat Nazirliyinə müraciət etsin və Fond dövlət qeydiyyatına alındığı gündən 1 (bir) gün müddətində bu barədə Azərbaycan Respublikasının Nazirlər Kabinetinə məlumat versin;
3.3. bu Qərardan irəli gələn digər məsələləri həll etsin.
4. Müəyyən edilsin ki:
4.1. Fondun Nizamnamə fondu 1 (bir) milyon manat təşkil edir və Nazirlik tərəfindən tabeliyindəki təhsil müəssisələrinin (peşə təhsili müəssisələri istisna olmaqla) büdcədənkənar vəsaitindən, habelə ödənişli təhsil xidmətləri göstərilməsindən əldə etdikləri gəlirlərdən ayırmalar hesabına təmin olunur.
4.2. Fondun saxlanması xərcləri və fəaliyyəti Nazirlik tərəfindən bu Qərarın 4.1-ci bəndində qeyd edillən vəsait, eləcə də Fondun fəaliyyətindən əldə edilmiş digər vəsait hesabına maliyyələşdirilir.
5. Bu Qərarla təsdiq edilmiş Nizamnamədə dəyişiklik Azərbaycan Respublikası Prezidentinin 2002-ci il 24 avqust tarixli 772 nömrəli Fərmanı ilə təsdiq edilmiş "İcra hakimiyyəti orqanlarının normativ hüquqi aktlarının hazırlanması və qəbul edilməsi qaydası haqqında Əsasnamə"nin 2.6-1-ci bəndinə uyğun edilə bilər.

**Əli Əsədov**
**Azərbaycan Respublikasının Baş naziri**
**Bakı şəhəri, 1 mart 2022-ci il**

*1921 -ci ildən təhsilimizin keşiyində...*

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur. | Fevral, 2022 / № 09 (1112)

# ADPU-NUN KİTABXANA-İNFORMASİYA MƏRKƏZİNİN YENİDƏNQURMADAN SONRA AÇILIŞI OLUB




Mart ayının 1-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Kitabxana-İnformasiya Mərkəzinin yenidənqurmadan sonrakı açılışına və Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev tərəfindən universitetin 100 illik yubileyi ilə əlaqədar təltif edilmiş əməkdaşlarına mükafatların təqdim edilməsinə həsr olunmuş tədbir keçirilib.

ADPU-nun rektoru professor Cəfər Cəfərov, Azərbaycan Respublikasının təhsil naziri Emin Əmrullayev və "BP Azərbaycan" şirkətinin vitse-prezidenti Bəxtiyar Aslanbəyli yenidən qurulan Kitabxana-İnformasiya Mərkəzinin açılışını bildirən lenti kəsiblər. Daha sonra qonaqlar burada yaradılan şərait və göstərilən xidmətlərlə tanış olublar. Təhsil nazirinə kitabxananın ən müasir elektron sistemlər əsasında qurulmuş iş prinsipi haqqında məlumat verilib.

Qeyd olunub ki, bu layihə korporativ sosial məsuliyyət prinsipini rəhbər tutan "BP Azərbaycan" şirkəti tərəfindən maliyyələşdirilib. Nəticədə ölkəmizin müəllim hazırlığının mərkəzi olan Pedaqoji Universitetdə ən müasir tələblərə cavab verən kitabxana-xidmət infrastrukturu formalaşdırılıb. Tələbə, magistr və doktorantlar üçün mərkəzdə rahat iş şəraiti yaradılıb.

Nazir E.Əmrullayev kollektivi təbrik edərək bildirib ki, kitabxana infrastrukturu istənilən ali təhsil müəssisəsinin fəaliyyətində ən vacib məsələlərdən biridir. ADPU-da belə fərqli mühitin yaradılması da təhsil xidmətinin təşkilində yeni stimuldur. Bu baxımdan layihə universitetin 100 illiyinə yaxşı hədiyyə hesab oluna bilər.

B.Aslanbəyli də öz növbəsində Universitet heyətini təbrik edərək hər zaman bu tip layihələrin icrasında maraqlı olduqlarını bildirib.

Rektor C.Cəfərov göstərilən diqqətə görə Təhsil Nazirliyinə və "BP Azərbaycan" şirkətinə Pedaqoji Universitetin kollektivi adından təşəkkürünü bildirib və vurğulayıb ki, ADPU 750 min nüsxə kitabxana fondu ilə ölkənin ikinci ən böyük universitet kitabxanasına sahibdir.

Rektor qeyd edib ki, Təhsil Nazirliyi, Heydər Əliyev Fondu, müxtəlif özəl qurumların dəstəyi ilə ADPU-da bir çox yenidənqurma işlərinə imza atılıb. Bu da öz növbəsində dövlət, ictimai və özəl sektorun birgə əməkdaşlığı ilə təhsilimizin inkişafı yolunda uğurlu fəaliyyətin icra olunduğunun göstəricisidir.

Mərkəzin açılışında həmçinin Azərbaycan Milli Kitabxanasının direktoru Kərim Tahirov, habelə müxtəlif ali təhsil müəssisələrinin kitabxana rəhbərləri də iştirak ediblər.

Mükafatlandırma mərasimində təhsil naziri Emin Əmrullayev çıxış edərək bildirib ki, pedaqoji iş və pedaqoji kadrların hazırlanması istənilən təhsil sisteminin özəyidir. Bu mənada bu ADPU-da verilən təhsil ölkənin gələcəyini yönəldən strateji işdir. Burada verilən təhsil bəlli müddət sonra orta məktəblərimizdə öz əksini tapır. Bu baxımdan maddi resurslarla yanaşı bacarıqların aşılanması, şəxsiyyətin yetişdirilməsi prosesinə diqqətin artırılması vacibdir. Nazir bildirib ki, 44 günlük Vətən müharibəsində torpaqlarımız işğaldan azad olunandan sonra təhsil sisteminin qarşısında daha böyük hədəflər var.

Artıq bu ilin sonunda Şuşada ilk məktəbin fəaliyyətə başlaması planlaşdırılır. Bu mənada ADPU-da yetişdirilən gənc müəllimlər qarşısındakı tələblər daha da çoxalır.

Son illər Pedaqoji Universitetdə aparılan islahatlar nəticəsində xeyli irəliləyişlər əldə edilib. Lakin biz bunlarla yanaşı daim dünya təhsil trendlərini izləyərək bu istiqamətdə müvafiq işlərin görülməsi zəruridir.

Daha sonra Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin Sərəncamı ilə ADPU-nun 100 illik yubileyi münasibətilə "Azərbaycan Respublikasının Prezidentinin Fərdi Təqaüdü", "Əməkdar müəllim" fəxri adı, "Tərəqqi" medalı, "3-cü dərəcəli Əmək ordeni", "Azərbaycan Respublikasının Prezidentinin Fəxri Diplomu" və "Şöhrət" ordeni təltif edilən 53 nəfər əməkdaşına mükafatları təqdim olunub.

Çıxış edən rektor prof. C.Cəfərov göstərilən yüksək etimada görə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevə və Təhsil Nazirliyinin rəhbərliyinə minnətdarlığını bildirərək Pedaqoji Universitetin çoxminli professor-müəllim heyətinin onlar qarşısında qoyulan vəzifələrin ən yüksək səviyyədə icrası üçün daha da əzmlə çalışacağını vurğulayıb. Tədbir çərçivəsində nazir E.Əmrullayev universitetdə TÜRKSOY kafedrasının, Heydər Əliyev Muzeyinin, Təhsil Nazirliyinin dəstəyi ilə yaradılan kompüter laboratoriyalarının fəaliyyəti ilə tanış olub, Filologiya fakültəsində yaradılan "Zəfər guşəsi"nə baxış keçirib. Həmçinin Filologiya və Riyaziyyat fakültələrində tələbələrin tədris prosesi müşahidə olunub. Mərasimin sonunda xatirə fotosu çəkdirilib.

# ADPU ƏMƏKDAŞLARININ ƏMƏKHAQLARI ARTIRILDI







Mart ayının 2-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Elmi Şurasının iclası keçirilib. Əvvəlcə universitetin 100 illik yubileyi münasibətilə Azərbaycan Respublikasının Təhsil Nazirliyi tərəfindən "Azərbaycan Respublikasının Qabaqcıl Təhsil İşçisi" döş nişanı və "Azərbaycan Respublikası Təhsil Nazirliyinin Fərxi Fərmanı" ilə təltif edilmiş əməkdaşlara mükafatların təqdim edilməsi mərasimi keçirilib.

ADPU-nun rektoru professor Cəfər Cəfərovun giriş sözü ilə çıxış edərək ötən dövr ərzində görülən işlərdən danışaraq qeyd edib ki, universitetin 100 illik yubileyinin keçirilməsi, dövlət və özəl sektorun dəstəyi ilə icra olunan bir çox infrastruktur layihələri, - Kitabxana-İnformasiya Mərkəzinin ən müasir rəqəmsal texnologiyalar əsasında yenidən qurulması, 150 kompüterdən ibarət 5 müasir kompüter laboratoriyasının qurularaq burada tələbələrin Alqoritmika təlimlərinə cəlb olunmaları, universitetin şəbəkəsinin qurulması kimi işlər tədqiqat universiteti olmaq və ən keyfiyyətli pedaqoji ali təhsil vermək yolunda ADPU-nun durmadan irəlilədiyinin göstəricisidir. Rektor bildirib ki, cari semestrdən etibarən 67 nəfər tələbəmiz pedaqoji internaturaya keçid üçün "Gələcəyin müəllimi" layihəsi çərçivəsində ucqar rayonlarda təcrübəyə göndərilib.

C.Cəfərov deyib: "Xüsusilə qeyd etmək lazımdır ki, ADPU-da təhsil alan 45 nəfər şəhid qardaş-bacısı olan tələbələrin ödənişli əsaslarla təhsil alan 7-nin təhsil haqqını ödəməyi universitet öz öhdəsinə götürüb. O cümlədən bir neçə sahibkar universitetə müraciət edərək aztəminatlı ailələrdən olan müəyyən sayda tələbələrin təhsil haqlarını ödəməyi öhdələrinə götürüblər. Bu kimi sosial töhfələr böyük nümunədir."

Ardı 3-cü səhifədə

Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov ADPU-da 2021/2022-ci tədris ilinin payız imtahan sessiyasının nəticələri barədə məruzə edib. Əvvəlcə 2021-ci ildə ADPU-ya qəbul olunmuş tələbələrlə Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin keçirdiyi onlayn motivasiya sorğusunun nəticələri təqdim edilib. Qeyd olunub ki, 2625 respondentdən 70,4 %-i "Nə üçün ADPU-nu seçmisiniz?" sualına "Müəllim olmaq istəyirəm" cavabını veriblər. O cümlədən 85 % tələbə təhsilini tamamladıqdan sonra müəllim olaraq çalışmaq istədiyini bildirib. Onlardan 32 %-i isə ixtisas seçimində ilk yerdə Pedaqoji Universiteti qeyd edib, 92 %-i isə ilk yerləşdirmədə ADPU-ya qəbul olunublar. Rəyi soruşulanların 68 %-ə qədəri universitet haqqında məlumatı ADPU-nun rəsmi sosial mediya hesablarından (40 %) və saytından (28 %) əldə etdiklərini bildiriblər. Bu da ictimaiyyətlə əlaqələr sahəsində qurulan effektiv onlayn kommunikasiya mexanizminin göstəricisidir.

Prorektor bildirib ki, ADPU-da imtahanlar tərtib olunmuş cədvəl üzrə 03 yanvar 2022 - 03 fevral 2022-ci il tarixlərində bütün tədris korpuslarında keçirilmişdir. Fevral ayının 15-dək isə 25 % imtahanları və üzürlü səbəbdən imtahanlarda iştirak edə bilməyənlərin imtahanları təşkil olunmuşdur.

Ümumilikdə universitetin Bakıdakı tədris binalarında 10649 nəfər, filiallarda 3645 nəfər, Pedaqoji Kollecdə isə 3257 nəfər tələbə imtahanlarda iştirak edib. Ümumilikdə 3853 nəfər apellyasiya verib ki, hər bir müraciət üzrə müvafiq qərar qəbul olunub. O cümlədən ADPU-da tələbələrin müvəffəqiyyət və keyfiyyət göstəriciləri daimi monitoriq olunur, imtahan prosesi haqqında tələbələrin rəyi öyrənilir. Son imtahan sessiyasının yekunlarına görə bakalavrların müvəffəqiyyət göstəriciləri 78 %, keyfiyyət göstəriciləri isə 38 % olub.

Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov ADPU-nun elmi-tədqiqat və elmi-təşkilati fəaliyyəti barədə hesabatla çıxış edib. Prorektor magistrantların imtahan sessiyasının yekunları haqqında məlumat verərək bildirib ki, imtahanlarda iştirak edən 602 nəfərdən 595 nəfəri, yaxud 99 %-i müvəffəq qiymət almışdır. Onların keyfiyyət göstəriciləri isə 77 % olmuşdur.

Bu da təhsilin keyfiyyətinin bir göstəricisidir. Tədris departamentinin müdiri dosent Sənan Əliyev bildirib ki, ADPU-da tələbələrin təcrübələrinin təşkili istiqamətində çoxşaxəli fəaliyyət icra olunur. Ümumtəhsil məktəbləri ilə yanaşı artıq Landau School, Hədəf liseyi, Azərbaycan-Britaniya məktəbi kimi özəl müəssisələrdə də tələbələrin pedaqoji təcrübə keçməsi və karyera imkanlarını artırmaları təmin olunur. O cümlədən bu ildən etibarən alqoritmika təlimlərinə cəlb olunan 166 nəfər tələbənin təcrübəsi alqoritmika sinifləri olan məktəblərdə, 67 könüllü tələbənin təcrübəsi isə pedaqoji internatura əsasında ucqar rayonlarda təşkil olunur.

Daha sonra Rektorun müşaviri Ümid Mehdiyev Maliyyə komissiyasının hesabat və təkliflərini diqqətə çatdırıb.

Təkliflərə əsasən Elmi Şura ADPU-da əməkdaşların əməkhaqqının artırılması haqqında qərar qəbul edib. Qərara əsasən, həmçinin Pedaqoji Universitetdə saathesabı dərs deyən personalın əməkhaqqı da orta hesabla 37,5 % artırılıb. O cümlədən İrəvan Müəllimlər Seminariyasının 140 illiyi münasibəti ilə Pedaqoji Universitetdə "Firudin bəy Köçərli adına Adlı təqaüd"ün təsis edilməsi haqqında qərar qəbul edib. Bu təqaüd hər il universitetə ən yüksək balla qəbul olunan tələbəyə 1 il müddətində veriləcək. Qeyd edək ki, hazırda ADPU-da hər biri 204 azn məbləğində olan 11 adlı təqaüd var.

İclas cari məsələlərin müzakirəsi ilə davam etdirilib.

## ADPU TƏLƏBƏ GƏNCLƏR TƏŞKİLATI ÜÇÜNCÜ DƏFƏ "İLİN TGT-Sİ" SEÇİLİB

Azərbaycan Respublikasının Gənclər Fondunun dəstəyi ilə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı (ATGTİ) tərəfindən Gənclər Gününə həsr olunmuş Tələbə Gənclər Təşkilatlarının "I Strateji Planlaşdırma Forumu" keçirilib.

Forumda 2021-ci ildə ölkədə ictimai və sosial əhəmiyyətli, o cümlədən könüllü fəaliyyətin təşkili və həyata keçirilməsində fəal iştirakına görə ADPU TGT "İlin ən yaxşı TGT-si" adına layiq görülüb. Eyni zamanda ADPU TGT-nin ictimaiyyətlə əlaqələr üzrə sədr müavini Gülnar Xanəliyeva "İlin TGT nümayəndəsi" adı və daha 20 nəfər idarə heyəti üzvü isə Fəxri Fərmanla təltif olunublar.




## PEDAQOJİ UNİVERSİTETDƏ "2 FEVRAL - AZƏRBAYCAN GƏNCLƏRİ GÜNÜ" MÜNASİBƏTİ İLƏ GÖRÜŞ KEÇİRİLİB

Fevralın 2-də "2 Fevral – Azərbaycan Gəncləri Günü" münasibətilə universitetinin ictimai fəaliyyətdə və təhsildə fərqlənən tələbələri ilə görüş keçirilib. Görüşdə ADPU-nun tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov, elm və innovasiyalar üzrə prorektoru professor Asəf Zamanov, sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev və Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli iştirak ediblər. Görüşdə 2021-ci il ərzində fakültələr, SABAH qrupları və Magistratura və doktorantura şöbəsi



üzrə ən yüksək təhsil göstəricilərinə malik olan 12 nəfər tələbə, o cümlədən universitetin ictimai təşkilatları, – Tələbə Gənclər Təşkilatı, Tələbə Həmkarlar İttifaqı Komitəsi, Təhsil Könüllüləri İctimai Birliyi, ADPU Könüllüləri Tələbə Birliyi və "MEH" ədəbi dərnəyində aktivliyi ilə seçilən 33 nəfər tələbəyə fəxri fərmanlar təqdim edilib. Tələbələrdən fakültə və universitet birinciləri Murad Rizvanlı və Əli Məmmədzadə çıxış edərək Pedaqoji Universitetdə yaradılan əlverişli təhsil və ictimai inkişaf mühitindən razılıqlarını ifadə ediblər. Qeyd olunub ki, ADPU rəhbərliyi aktiv tələbələrin təhsil və karyeralarını universitetdə davam etdirmələrində, onların tədqiqatlara cəlb olunmasında maraqlıdır.

## PEDAQOJİ UNİVERSİTETİN FƏAL TƏLƏBƏLƏRİ GƏNCLƏR GÜNÜ MÜNASİBƏTİLƏ TƏLTİF EDİLİBLƏR



ADPU tələbələri təhsillərində olduğu kimi, ölkəmizin ictimai həyatında da özünəməxsus yer tuturlar. Belə ki, "2 Fevral – Azərbaycan Gəncləri Günü" münasibətilə Universitetin dörd nəfər aktiv tələbəsi müxtəlif qurumlar tərəfindən təltif edilib. Gənclər Günü münasibətilə ADPU-nun Tələbə Gənclər Təşkilatının sədri İsmayıl Nəsirov Nəsimi rayon İcra Hakimiyyətinin Fəxri Fərmanı ilə təltif edilib.

Bundan başqa Yeni Azərbaycan Partiyası Səbail rayon təşkilatı tərəfindən uzunmüddətli ictimai fəaliyyəti ilə seçilən, hazırda İrəli İctimai Birliyinin İnsan resursları katibliyində baş koordinator kimi çalışan Tərlan Ağayev "İlin gənci" adı ilə, Tələbə Həmkarlar İttifaqı Komitəsinin sədr müavini Səkinəxanım Mirzəzadə və ADPU Könüllüləri Tələbə Birliyinin sədri Asim İbrahimov isə Fəxri Fərmanla təltif edilib.

## "MÜASİR TƏHSİL SİSTEMİNDƏ İKT VƏ İNFORMASİYA SAVADLILIĞI" MÖVZUSUNDA TƏLİM




Beynəlxalq əlaqələr üzrə prorektorluğunun nəzdində Təlim-tədris mərkəzi "Müasir təhsil sistemində İKT və informasiya savadlılığı" mövzusunda fevralın 7-dən 12-dək davam edən onlayn təlimlər təşkil edib. Təlimçi Aygün Cəfərovanın professor-müəllim heyətinin səriştələrinin artırılması üçün internet imkanlarının onlayn tədrisə tətbiqi, Web-2 alətlərindən istifadə qaydaları, təhlil və tətbiq yolları haqqında biliklərin əhatə olunduğu təlimində 70-dən çox müəllim iştirak edib.

## MAGİSTRANTLARIN ELMİ-TƏDQİQAT TƏCRÜBƏSİNİN BAŞLANMASINA HƏSR EDİLMİŞ KONFRANS KEÇİRİLİB

Fevralın 15-də universitetdə magistrantların elmi-tədqiqat təcrübəsinin başlanmasına həsr olunmuş konfrans keçirilib. Konfransda professor-müəllim heyəti, müvafiq struktur rəhbərləri və təcrübəçi magistrantlar iştirak ediblər.

Açılış nitqi ilə çıxış edən elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov qeyd edib ki, aparılan təhlillər nəticəsində cari ildən etibarən universitetdə magistrantların təcrübələrinin təşkili qaydalarında dəyişiklik edilib. Belə ki, əvvəlki illərdən fərqli olaraq artıq əvvəlcə elmi-tədqiqat təcrübəsi, sonra isə elmi-pedaqoji təcrübə təşkil ediləcək. Bu dəyişikliyin elmi əsası ondan ibarətdir ki, artıq apardıqları elmi-tədqiqat işlərini yekunlaşdıraraq dissertasiya işləri və elmi məqalələri üzərində işləyən IV semestr magistrantları üçün elmi-tədqiqat təcrübəsinin elmi-pedaqoji təcrübədən əvvələ keçirilməsi daha münbit şərait yaradır. Həmçinin cari ildən magistr dissertasiyalarının qiymətləndirilməsi formasında da dəyişiklik edilib. Artıq kafedralar dissertasiya işlərini müdafiəyə tövsiyə edəcək, qiymətləndirilmə isə tam olaraq ixtisaslaşmış şuralarda aparılacaq.




Çıxış edən Magistratura və doktorantura şöbəsinin müdiri, siyasi elmlər üzrə fəlsəfə doktoru Rəşad Sadıqov bildirib ki, bu semestrdə 21 ixtisas üzrə təhsil alan II tədris ili magistrantları 25 kafedrada 1 ay müddətində elmi-tədqiqat təcrübəsi keçəcək, onların fəaliyyətləri müvafiq kafedralar və təcrübə rəhbərləri tərəfindən qiymətləndiriləcək. Mart ayının 16-dan etibarən isə elmi-pedaqoji təcrübəyə start veriləcək.

R.Sadıqov vurğulayıb ki, elmi-tədqiqat təcrübəsində iştirak edən 318 magistrantdan 3 nəfəri Çin Xalq Respublikasının vətəndaşlarıdır.

## PROFESSOR YÜKSEL KAVAK ADPU-DA SEMİNAR KEÇİB

Fevralın 18-də "T-Network" təhsil işçilərinin təcrübə və kommunikasiya platformasının təşkilatçılığı ilə Bakıya dəvət olunan Türkiyənin TED Universitetinin Təhsil fakültəsinin dekanı professor Yüksel Kavak Pedaqoji Universitetin qonağı olub.

Rektor professor C.Cəfərovla görüşdən sonra prof. Y.Kavak universitet kollektivi qarşısında "Təhsil müəssisələrində strateji planlaşdırma" mövzusunda təqdimatla çıxış edib.




## XOCALI SOYQIRIMINA HƏSR OLUNMUŞ İNTELLEKTUAL TURNİR KEÇİRİLİB

Fevralın 19-da "ADPU Könüllüləri" Tələbə Birliyinin təşkilatçılığı ilə Xocalı soyqırımının 30-cu ildönümünə həsr olunmuş "Nə? Harada? Nə zaman?" (NHN) formatında intellektual turnir keçirilib.

Universitetin müxtəlif fakültələrinin tələbələrindən ibarət 15 komandanın mübarizə apardığı gərgin yarışın nəticələrinə görə "Kripton" komandası təqdim olunan 16 sualdan 13-nü doğru cavablandıraraq turnirin qalibi olub. Növbəti yerləri isə müvafiq olaraq 9 balla "Terapi" və "Topçubaşov" komandaları, 8 balla "Dəmir yumruq", "Bermuda" və "Varibiality" komandaları bölüşür.





## "OPEN SCIENCE" PLATFORMASININ TƏBLİĞİ İLƏ BAĞLI SEMİNAR KEÇİRİLİB



Pedaqoji Universitetində Təhsil Nazirliyi, Azərbaycan Gənc Alim, Doktorant və Magistrlər Cəmiyyəti və ADPU-nun Gənc Alimlər və Tədqiqatçılar şurasının birgə təşkilatçılığı ilə "Open Science Azərbaycan: gənc tədqiqatçılar arasında "Open Science" platformasının təbliği" layihəsi çərçivəsində seminar təşkil olunub.

Seminarı giriş sözü ilə açan elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov layihənin ADPU-da keçirilməsinin xüsusi əhəmiyyət daşıdığını vurğulayaraq gənc alim, tədqiqatçı və doktorantların akademik yazı bacarıqlarının inkişaf etdirilməsində əhəmiyyətindən danışıb. Prorektor ADPU-da elmi elitanın formalaşdırılması istiqamətində həyata keçirilən işlər barədə məlumat verib. Azərbaycan Gənc Alim, Doktorant və Magistrlər Cəmiyyətinin eksperti Sevinc Ədilova "Açıq tədqiqat materialları. İndekslər və data bazalar" adlı geniş təqdimatla çıxış edib. Bildirilib ki, "Open Science" platformasının əsas məqsədi gənc tədqiqatçılara, alim və doktorantlara "Open Science", "Open Access", "Open Research Date", "Open İnnovation", "Open Research Computation" və s. haqqında bilik və informasiyalar verməkdən ibarətdir.

## TGT XOCALI FACİƏSİNİN 30-CU İLDÖNÜMÜNƏ HƏSR OLUNMUŞ TƏDBİR KEÇİRİB



Fevralın 18-də universitetin Heydər Əliyev Məktəbinin Lektoriyasında ATGTİ-nin "Hədəf 10%" proqramı çərçivəsində ADPU TGT-nin Tarix klubu və Məktəbəqədər təhsil fakültəsinin birgə təşkilatçılığı ilə "Xocalı faciəsi tariximizin qan yaddaşıdır" adlı tədbir keçirilib. Tədbiri giriş sözü ilə açan ADPU-nun Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr şöbəsinin müdiri Turan Kərimli Xocalı soyqırımının 30-cu ildönümü ərəfəsində Universitet daxilində həyata keçiriləcək layihələrdən danışaraq faciə qurbanlarının əziz xatirəsinin hər birimizin yaddaşımıza əbədi həkk olunduğunu bildirib. Daha sonra Xocalı faciəsinin şahidi Dürdanə Ağayeva 30 il əvvəl şahidi olduğu hadisələri tələbələrlə bölüşmüş, ermənilərin törətdikləri faciədən ətraflı söz açmış, ADPU-nun dosenti Zakir Kərimov Xocalı faciəsinə tarixi aspektdən yanaşaraq mənfur qonşularımız tərəfindən beynəlxalq hüququn norma və prinsiplərinin kobud surətdə pozulduğunu, Azərbaycana qarşı misli görünməmiş soyqırımı aktının törədildiyini qeyd etmişdir.

## MÜASİR AZƏRBAYCAN DİLİ KAFEDRASI İLƏ DİLÇİLİK İNSTİTUTU ARASINDA MEMORANDUM İMZALANIB

Fevralın 21-də Filologiya fakültəsinin təşkilatçılığı ilə "Beynəlxalq Ana dili Günü" münasibəti ilə "Ana dilim! Bu dünyanın yaşı qədər tarixin var!" adlı tədbir keçirilib. Tədbirdə universitetin rəhbərliyi, prorektorlar, dekanlar və müvafiq struktur rəhbərləri, Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) İmadəddin Nəsimi adına Dilçilik İnstitutunun baş direktoru professor Nadir Məmmədli, habelə professor-müəllim heyəti, tələbələr iştirak ediblər.

Bədii hissədə fakültədə fəaliyyət göstərən "Meh ədəbi dərnəyi"nin üzvləri ədəbi-bədii kompozisiya ilə çıxış edərək Azərbaycan, ingilis, fransız, alman və rus dillərində ana dilinə aid şeirlər səsləndirib, mahnılar ifa edib, o cümlədən C.Məmmədquluzadənin "Anamın kitabı" əsərindən səhnə təqdim ediblər. Həmçinin tədbir iştirakçıları fakültənin alimlərinin elmi əsərləri ilə tanış olublar.

Çıxış edən rektor professor Cəfər Cəfərov bildirib ki, bu gün hər birimiz üçün bayramdır. Bu gün qeyd etdiyimiz "Beynəlxalq Ana dili Günü"ndə biz bir daha dünyanın ən zəngin dillərindən olan Azərbaycan dili kimi bir dilimiz olduğu üçün qürur duyuruq. Eyni zamanda Azərbaycan dövləti Azərbaycan dilinin inkişafını ən vacib məsələlərdən biri kimi daim diqqətdə saxlayır.

Prof. N.Məmmədli bildirib ki, ADPU-da dilçilik sahəsində aparılan ardıcıl fəaliyyət və təşəbbüskarlığı xüsusilə vurğulamaq lazımdır. Tədbir çərçivəsində ADPU-nun Müasir Azərbaycan dili kafedrası ilə AMEA İ.Nəsimi adına Dilçilik İnstitutu arasında əməkdaşlığa dair memorandum imzalanıb.

ADPU-nun beynəlxalq əlaqələr üzrə prorektoru, Filologiya fakültəsinin dekanı vəzifəsini icra edən professor Mahirə Hüseynova tədbir iştirakçılarına təşəkkürünü bildirərək qeyd edib ki, bu gün imzalanan memorandum ilə Dilçilik İnstitutu ilə mövcud əlaqələrin daha da genişlənməsinə, Universitetdə Azərbaycan dilinin tədrisi səviyyəsinə və aparılan tədqiqatlara əlavə stimul yaranmasına səbəb olacaq.









## ADPU-DA TƏLƏBƏLƏRƏ ALQORİTMİKA TƏLİMLƏRİ KEÇİRİLƏCƏK

Cari tədris ilində Azərbaycan Respublikası Təhsil Nazirliyinin dəstəyi ilə Universitetinin "Riyaziyyat və informatika müəllimliyi" və "İnformatika müəllimliyi" ixtisaslarında (SABAH qrupları daxil olmaqla) təhsil alan sonuncu kurs tələbələri üçün Alqoritmika təlimləri keçiriləcək. Bu məqsədlə Təhsil Nazirliyi tərəfindən ADPU-nun kompüter laboratoriyalarına 120 notbuk və 35 fərdi kompüter dəsti hədiyyə olunub.

Fevralın 21-də Təhsil Nazirliyinin aparat rəhbəri Həsən Həsənli və Təhsildə Keyfiyyət Təminatı Agentliyinin İdarə Heyətinin sədri Ülkər Səttarova ADPU-da layihə çərçivəsində istifadə olunacaq laboratoriyalarla tanış olublar. Universitetin rektoru professor Cəfər Cəfərov göstərilən diqqətə və dəstəyə görə Təhsil Nazirliyinin rəhbərliyinə təşəkkürünü bildirib. Qeyd edək ki, Alqoritmika Beynəlxalq proqramlaşdırma və riyaziyyat məktəbi (**Алгоритмика**) tərəfindən həyata keçiriləcək təlimlər fevral-may aylarını əhatə edəcək. Həftədə 3 dəfə olmaqla 4 saatlıq sessiyalarda keçiriləcək təlimlərdə ümumilikdə 166 nəfər tələbə iştirak edəcək. Sonda tələbələrin nailiyyət səviyyəsi qiymətləndirilərək müvafiq sertifikatlar təqdim ediləcək.



## QLAZOV DÖVLƏT PEDAQOJİ İNSTİTUTU İLƏ ƏMƏKDAŞLIQ HAQQINDA MÜQAVİLƏ İMZALANIB

Fevralın 22-də ADPU-da Rusiya Federasiyasının Udmurtiya Respublikasının Qlazov Dövlət Pedaqoji İnstitutunun (QDPİ) nümayəndələri ilə görüş keçirilib. Görüşdə QDPİ-nin rektoru Yanina Aleksandrovna Çiqovskaya-Nazarova, həmin universitetin Qəbul Komissiyasının məsul katibinin müavini Liliya İosifovna Belıx, Qəbul Komissiyasının aparıcı mütəxəssisi Yuliya İvanovna Dmitruk, Rusiya Federasiyası Udmurtiya Respublikası Hökumətinin Beynəlxalq əlaqələr üzrə müşaviri Dmitri Ryabov, Udmurtiyada yaşayan Azərbaycan diasporunu təmsil edən "Azərbaycan-Udmurtiya Dostluq İctimai Mərkəzi"nin sədri Zülfüqar Mirzəyev, Beynəlxalq Avrasiya Mətbuat Fondunun prezidenti Umud Mirzəyev, ADPU-nun rektoru professor Cəfər Cəfərov, tədris işləri üzrə prorektoru dosent Eldar Aslanov, sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, ADPU-nun nəzdində Azərbaycan Dövlət Pedaqoji Kollecinin direktoru dosent İsrayıl İsgəndərov və Beynəlxalq əlaqələr şöbəsinin baş mütəxəssisi Nurəngiz Mahmudova iştirak ediblər.







Görüş çərçivəsində ADPU və Qlazov Dövlət Pedaqoji İnstitutu arasında birgə onlayn konfransların, yay məktəblərinin və tədris proqramlarının təşkili, məqalələrin elmi jurnallarda qarşılıqlı dərci və sairə kimi əməkdaşlıq imkanları müzakirə olunub. Sonda ali təhsil müəssisəsinin rektorları arasında əməkdaşlıq müqaviləsi imzalanıb.

## MƏKTƏBLİLƏR "ANA DİLİMİZ MİLLİ SƏRVƏTİMİZDİR!" DEDİLƏR

21 fevral Beynəlxalq Ana Dili Günü münasibətilə Bakı şəhəri Suraxanı rayonu 279 nömrəli tam orta məktəbdə tədbir keçirilib.

Tədbirdə ADPU-nun Beynəlxalq əlaqələr üzrə prorektoru professor Mahirə Hüseynova, Azərbaycan dilçiliyi kafedrasının müdiri dosent İradə Kərimova, Müasir Azərbaycan dili kafedrasının müdiri dosent Könül Səmədova, Keyfiyyətin təminatı şöbəsinin müdiri dosent Qalib Şərifov, Məzun koordinasiya və karyera bölməsinin müdiri Könül Əsgərova, Bakı Şəhəri üzrə Təhsil İdarəsinin müdiri Mehriban Vəliyeva, Suraxanı Rayon İcra Hakimiyyətinin başçısı Əziz Əzizov və rayonun digər ictimai qrum rəhbərləri iştirak edibləр.

Tədbirdən öncə ADPU-nun bir qrup tələbəsinin iştirakı ilə Beynəlxalq Ana Dili Gününə həsr olunan açıq dərslər keçirilib.

Prof. Mahirə Hüseynova Ana dilinin tərəqqisi üçün çalışmağın vacibliyindən danışıb və bildirib ki, ümumtəhsil müəssisələrində təhsil alan şagirdlərə doğma dilimizi sevdirən müəllimlərin zəhməti danılmazdır.

"Ana dilimiz milli sərvətimizdir!" çağırışını səsləndirən şagirdlər doğma dilimizə həsr edilən şeirlər, mahnılar söyləyib, ədəbi-bədii kompozisiyalar nümayiş etdiriblər.








## PROREKTOR TGT İDARƏ HEYƏTİNİN ÜZVLƏRİNİ QƏBUL EDİB

Universitetin sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev Tələbə Gənclər Təşkilatının (ADPU TGT) İdarə Heyətinin üzvlərini qəbul edib.

Görüşdə ADPU TGT-nin həm universitetdaxili, həm də universitetlərarası fəaliyyətindən razılıq ifadə olunub. Vurğulanıb ki, universitet rəhbərliyinin dəstəyi ilə tələbələrin ictimai-sosial ehtiyaclarının dəstəklənməsində aktiv fəaliyyət göstərən ADPU TGT cari ilin Gənclər Günündə Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqı tərəfindən artıq 3-cü dəfə "İlin TGT-si" seçilib.



## ADPU-DA "XX YÜZİLLİYİN FACİƏSİ" ADLI ANIM TƏDBİRİ KEÇİRİLİB

Fevralın 24-də ADPU-nun Heydər Əliyev Mərkəzinin təşkilatçılığı ilə Xocalı soyqırımının 30-cu ildönümünə həsr olunan "XX yüzilliyin faciəsi" adlı anım tədbiri keçirilib.

Əvvəlcə soyqırımı qurbanlarının və Vətən uğrunda canlarından keçmiş bütün şəhidlərin xatirəsi bir dəqiqəlik sükutla yad edildi. Daha sonra faciəyə həsr olunmuş qısametrajlı film nümayiş olundu.

Tədbirdə çıxış edən ADPU-nun rektoru, professor Cəfər Cəfərov bildirdi ki, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin yanvar ayının 28-də imzaladığı "Xocalı soyqırımının otuzuncu ildönümü haqqında" Sərəncamda bu qətliam "Azərbaycan tarixinin ən dəhşətli səhifələrindən biri" və "Ermənistanın uzun illərdən bəri Azərbaycana qarşı həyata keçirdiyi etnik təmizləmə və təcavüz siyasətinin tərkib hissəsi" kimi xarakterizə olunur.

Natiq qeyd etdi ki, XX yüzillikdə 4 dəfə azərbaycanlılara qarşı kütləvi deportasiya ilə müşayiət olunan soyqırımı aktları baş verib. Yalnız Birinci Qarabağ müharibəsində 20 minədək həmvətənimiz şəhid oldu, 50 minədək insan sağlamlığını itirdi, 1 milyondan çox soydaşımız qaçqın və ya məcburi köçkün vəziyyətinə salındı. Müharibənin kuliminasiya nöqtəsi, ən dəhşətli epizodu isə Xocalı qətliamı oldu. Qana susamış ermənilər cəmi bir gecədə Xocalı şəhərinin 613 dinc sakinini qətlə yetirdilər, 487 nəfərə ağır bədən xəsarəti yetirdilər, 1275 nəfəri girov götürdülər.

Xocalı qətliamı 1992-ci ildə müasir dünyanın gözü qarşısında törədilsə də, onun xarici dövlətlər tərəfindən soyqırımı kimi tanınmasına nail olmaq üçün həm xeyli vaxt, həm də ardıcıl, məqsədyönlü və gərgin iş aparılması lazım gəldi. 2007-ci ildə Azərbaycan Respublikası Prezidentinin tövsiyəsi ilə Milli Məclis xarici ölkələrin parlamentlərinə və beynəlxalq təşkilatlara xüsusi müraciət ünvanladı. 2008-ci ildə Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla Əliyevanın təşəbbüsü ilə "Xocalıya Ədalət" beynəlxalq kampaniyası təsis olunduqdan sonra bu yöndəki fəaliyyət daha geniş miqyas aldı. Cənab Prezidentin beynəlxalq aləmdəki nüfuzu, müvafiq dövlət orqanlarının və Heydər Əliyev Fondunun birgə səyləri sayəsində ötən dövr ərzində 10-dan çox ölkə, habelə ABŞ-ın 24 ştatı faciəni soyqırımı və ya bəşəriyyətə qarşı törədilmiş ağır cinayət kimi tanıdı. Beynəlxalq dövlətlərarası təşkilatlardan İslam Əməkdaşlıq Təşkilatı soyqırımını birmənalı şəkildə tanıyan qətnamələr qəbul etdi.







Çıxışının sonunda rektor qeyd etdi ki, Xocalı qurbanlarının qanı yerdə qalmadı, 2020-ci ilin payızında rəşadətli ordumuz Ali Baş Komandanın rəhbərliyi ilə mənfur düşməni darmadağın edərək, təslim aktını imzalamağa məcbur etdi. Beləliklə, 30 il işğal altında qalan torpaqlarımız cəmi 44 günə azad edildi. Buna görə də bu gün həm Xocalı qurbanlarının, həm də Vətənin bütövlüyü yolunda həlak olmuş bütün şəhidlərimizin ruhu şaddır.

Daha sonra dosent Pərviz Səfərov "Xocalı qətliamı Azərbaycan xalqına qarşı törədilmiş ağır cinayətdir", baş müəllim Samirə Ramazanova "Soyqırımı aktına xarici dövlətlərin və KİV-in reaksiyası" mövzusunda məruzələrlə çıxış etdilər. Magistrant Aytac Rəhimova müasir informasiya cəmiyyəti şəraitində tarixi ədalətin bərpasında, xalqımızın başına gətirilən faciələrin beynəlxalq aləmdə tanıdılmasında gənclərin rolundan danışdı.

Tədbirin sonunda Laçın şəhər 1 nömrəli musiqi məktəbinin müəllim və şagirdlərinin ifasında ədəbi-bədii və musiqili kompozisiya nümayiş olundu.

# ADPU-DA HƏSƏN MİRZƏYEVİN XATİRƏSİ ANILIB

Fevralın 25-də ADPU-nun prorektoru professor Mahirə Hüseynovanın təşəbbüsü ilə universitetin Müasir Azərbaycan dili kafedrasında kafedranın yaradıcısı və ilk müdiri olmuş görkəmli dilçi-türkoloq, Əməkdar elm xadimi, tanınmış ictimai xadim, pedaqoq, Azərbaycan Respublikası Prezidentinin fərdi təqaüdçüsü, "Şöhrət" ordenli, filologiya elmləri doktoru, professor Həsən İbrahim oğlu Mirzəyevin xatirəsinə həsr olunmuş tədbir keçirilib.

Tədbiri giriş sözü ilə açan kafedranın müdiri, prof. H. Mirzəyevin aspirantı olmuş dosent Könül Səmədova böyük alimin həyat və fəaliyyəti haqqında məlumat verib.

Sonra kafedranın professoru, Əməkdar müəllim, Prezident təqaüdçüsü Cəfər Cəfərov Həsən Mirzəyev haqqında xatirələrini bölüşüb. O, görkəmli alimin Azərbaycan filologiya elminin inkişafında özünəməxsus xidmətləri olmasından bəhs edib. H.Mirzəyevin dilçiliyin müxtəlif problemlərinə dair bir sıra sanballı tədqiqatlarından, alimin xüsusən Qərbi Azərbaycanın yer adları ilə bağlı araşdırmalarının milli tariximizin öyrənilməsi baxımından xüsusi əhəmiyyət kəsb etdiyini vurğulayıb.

Çıxış edənlərdən kafedranın professoru Mirvari İsmayılova, Elmi-Tədqiqat Mərkəzinin Türk araşdırmaları şöbəsinin müdiri professor Elman Quliyev, Ədəbiyyatın tədrisi texnologiyası kafedrasının dosenti Fəxrəddin Yusifov da Həsən Mirzəyevin keçdiyi həyat yolundan, elmi yaradıcılığından, pedaqoji və ictimai fəaliyyətindən danışıblar.






Tədbirin bədii hissəsində fakültənin "Meh" ədəbi dərnəyinin üzvü olan tələbələr tanınmış şairə professor Mahirə Nağıqızı – Hüseynovanın müəllimi Həsən Mirzəyevə həsr etdiyi şeirlərini qiraət etmiş, Həsən Mirzə ilə aşıq Səadət Butanın deyişməsini səsləndirmişlər.

Tədbirin sonunda görkəmli alim Həsən Mirzəyevin 13 cildlik külliyyatı Filologiya fakültəsinin professor-müəllim heyəti tərəfindən 10 əlaçı tələbəyə hədiyyə edilib.

## RİYAZİYYAT FAKÜLTƏSİNDƏ XOCALI SOYQIRIMINA HƏSR OLUNAN TƏDBİR KEÇİRİLİB



ADPU-nun Riyaziyyat fakültəsində Xocalı soyqırımının 30-cu ildönümünə həsr olunmuş tədbir keçirilib. Tədbirdə fakültənin professor-müəllim heyəti, magistr və fəal tələbələr iştirak ediblər.

Tədbir Xocalı soyqırımı qurbanlarının xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlamışdır.

Riyaziyyat fakültəsinin dekanı dosent Araz Fərəcov çıxış edərək Xocalı soyqrımı haqqında geniş məlumat vermişdir. O qeyd edib ki, Azərbaycan dövlətinin apardığı uğurlu siyasət nəticəsində bu gün dünya dövlətləri də artıq ermənilərin törətdikləri bu soyqırıma öz münasibətlərini bildirir və Xocalıda törədilmiş qətiliamı kəskin şəkildə pisləyirlər.

Professor B.Əliyev, dos.N.Nəsirov çıxış edərək XX əsrin faciəsi olan Xocalı soyqırımı haqqında təəssüratlarını bölüşüblər.

## ADPU TƏLƏBƏLƏRİ XOCALI QURBANLARININ XATİRƏSİNİ FLƏŞMOBLA YAD EDİBLƏR

Fevralın 25-də Xocalı soyqırımının ildönümü münasibəti ilə ADPU-da fləşmob keçirilib. Təxminən 160 nəfərdən çox tələbənin iştirak etdiyi fləşmob Pedaqoji Universitetdə fəaliyyət göstərən ADPU Könüllüləri Tələbə Birliyi (AKT) və Meh ədəbi dərnəyinin təşkilatçılığı ilə həyata keçirilib. İştirakçılar Xocalı faciəsinin 30-cu ildönümünü anmaq məqsədilə Universitetin həyətində "Xocalı 30" yazısını canlandırıblar.



## ADPU TGT "ANA HARAYI" ADLI TƏDBİR KEÇİRİB

Fevralın 25-də Hədəf 10% proqramı çərçivəsində ADPU TGT-nin SABAH qrupları, İncəsənət və fiziki tərbiyə fakültəsi təşkilatları və ART Klubunun birgə təşkilatçılığı ilə Suraxanı Gənclər Evində "Ana harayı" adlı tədbir keçirilib. Tədbirdə Ana harayı abidəsinin müəlliflərindən biri, heykəltəraş Ağa Mahmud Rüstəmov, abidənin layihə rəhbəri Camal Rəşid Əlizadə, Suraxanı Gənclər evinin rəhbəri Natavan Rüstəmova, ATGTİ-nin sədr müavini, ADPU TGT-nin sədri İsmayıl Nəsirov, 30-a yaxın ADPU TGT fəalı və Gənclər Evinin nümayəndələri iştirak ediblər. Tədbirdə Camal Rəşid Əlizadə və Ağa Mahmud Rüstəmov "Ana harayı" abidəsinin tikilməsi ilə bağlı maraqlı faktları tələbələrin diqqətinə çatdıraraq onların suallarını cavablandırmışlar. Eyni zamanda tədbirdə Pedaqoji Universitetin tələbələrinin Xocalı soyqırımının 30-cu ildönümü ilə əlaqədar çəkdiyi rəsmlər də nümayiş etdirilmiş və rəsm müəllifləri mükafatlandırılmışdır. Tədbirin sonunda "Xocalı bir millətin kədəri" sənədli filminin nümayiş etdirilib.



## ADPU TƏLƏBƏ GƏNCLƏR TƏŞKİLATI "MÜHARİBƏ CİNAYƏTLƏRİ" ADLI GÖRÜŞ KEÇİRİB




Fevralın 28-də "Hədəf 10%" proqramı ATGTİ-nin ofisində ADPU TGT-nin Vətənpərvərlik klubunun təşkilatçılığı ilə "Müharibə cinayətləri" adlı görüş keçirilib.

Görüşdə iştirak edən gənc hüquqşünas Nicat Şükürlü sivilizasiya yarandıqdan bu günə qədər baş verən müharibələr zamanı hüquq pozuntularından söz açmış, həmçinin 30-cu ildönümü tamam olan Xocalı soyqırımı zamanı xalqımıza qarşı törədilmiş cinayətləri, etnik təmizləmə siyasətini xüsusilə qeyd etmişdir.

Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİ

## MAGİSTRATURA VƏ DOKTORANTURA ŞÖBƏSİNDƏ "XOCALI SOYQIRIMI – 30 İL" MÖVZUSUNDA TƏDBİR KEÇİRİLİB

Fevralın 25-də Universitetin Magistratura və doktorantura şöbəsində "Xocalı soyqırımı - 30 il" mövzusunda tədbir keçirilib. Tədbirdə şöbənin əməkdaşları, müəllimlər və magistrantlar iştirak ediblər.

Əvvəlcə soyqırım qurbanların və bütün şəhidlərin əziz xatirəsi bir dəqiqəlik sükutla yad edilib. Şöbənin müdiri, s.e.f.d. Rəşad Sadıqov giriş sözü ilə çıxış edərək Xocalı soyqırımı haqqında danışıb, xalqımızın başına gətirilən bu qanlı faciənin heç vaxt sağalmayacaq yara kimi tariximizdə dərin və sağalmaz iz buraxdığını vurğulayıb. 44 günlük Vətən müharibəsi nəticəsində məhz Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə, şəhidlərimizin qanı, qazilərimizin qanı bahasına nail olduğumuz qələbə nəticəsində ölkəmizin ərazi bütövlüyü uğrunda həlak olmuş bütün şəhidlərimizin qisasının alındığı bildirilib.

T.ü.f.d. Səbinə Həziyeva Xocalı soyqırımının tarixi aspektlərindən, bu hadisənin törədilməsinin əsas məqsədlərindən, həmin dövrdə hadisələrin gedişindən və soyqırımın nəticələrindən söz açıb.

Çıxış edənlərdən baş mütəxəssis Dilguşə Süleymanova və I tədris ili magistrantı Nurxan Rəcəbli 30 il ötməsinə baxmayaraq, Xocalının əliyalın sakinlərinə qarşı törədilmiş vəhşiliklərinin unudulmadığını, bu hadisələrin təbliğində və Qarabağın bərpasında gənclərin üzərinə böyük məsuliyyət düşdüyünü qeyd ediblər.



Təbirdə şahidlərin dilindən Xocalı soyqırımının əks olunduğu videoçarxlar nümayiş olunub.

## "BEYNƏLXALQ ANA DİLİ GÜNÜ" MÜNASİBƏTİ İLƏ TƏLƏBƏLƏRLƏ GÖRÜŞ

Fevralın 21-də Təhsil Könüllüləri İctimai Birliyi (ADPU TKİB) və Filologiya fakültəsinin birgə təşkilatçılığı ilə "Beynəlxalq Ana dili Günü"nə həsr olunmuş "Könlüm şeir soraqlıdır" adlı görüş keçirilib.

Görüşdə Azərbaycan Respublikasının Əməkdar artisti, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) Səhnə danışığı kafedrasının dosenti, bədii qiraət ustası Ağalar Bayramov tələbələrin qonağı olub. A.Bayramov ana dilinin insan və xalq üçün önəmi haqqında danışaraq Məmməd Arazın poeziyasından, Bəxtiyar Vahabzadə irsindən parçalar səsləndirib.

Görüşdə iştirak edən A.Bayramovun dərs dediyi ADMİU tələbələri də müxtəlif poeziya nümunələri səsləndiriblər. Qiraət ustadı A.Bayramov "Mənəm, Ağalaram!" şeiri ilə tələbələrlə sağollaşıb.



## ADPU THİK ANIM MƏRASİMİ KEÇİRİB

Fevralın 25-də ADPU Tələbə Həmkarlar İttifaqı Komitəsinin (THİK) təşkilatçılığı ilə Xocalı soyqırımının 30-cu il dönümünə həsr olunmuş anım mərasimi keçirilib.

Əvvəlcə Xocalı şəhidləri bir dəqiqəlik sükutla yad edilib. Daha sonra ADPU THİK sədri dos. Vurğun Məmmədov, ADPU THİK Riyaziyyat fakültəsi sədri Cəmilə Qurbanova və sədr köməkçisi Sevinc Ağayeva çıxış edərək qeyd etmişlər ki, bu il soyqırımın ildönümü ikinci dəfədir ki, fərqli şəkildə anılır. Çünki 30 ildən sonra ermənilər tərəfindən işğal edilmiş torpaqlarımız azadlığa qovuşub, şəhidlərimizin qisası alınıb.



## ADPU-DA TƏLƏBƏLƏRƏ "DOLU" FİLMİ NÜMAYİŞ OLUNUB

Fevralın 22-də "ADPU Könüllüləri" Tələbə Birliyinin (AKT) Sinema klubunun təşkilatçılığı ilə Xocalı soyqırımına həsr olunmuş tədbir keçirilib.

Tələbələr əvvəlcə Xocalı soyqırımını əks etdirən miniatür rəsm sərgisi ilə tanış olmuş, daha sonra isə birlikdə "Dolu" filmini izləmişlər.

Ümumilikdə 200 nəfərin iştirak etdiyi tədbirdə tələbələrə erməni vandalizmi, onların törətdikləri cinayətlər haqqında məlumat verilmişdir.





Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 687

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / 